AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №4 (270), 66-73
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.006

AZƏRBAYCAN VƏ TÜRKMƏN ƏDƏBİYYATI

# Molla Murad Xarəzmi və onun "Dilavər və Güləsrar" dastanının təhlili

***Aynur Səfərli***
Bakı Dövlət Universitetinin doktorantı, DİN Polis Akademiyası, Elmi Tədqiqat və Redaksiya-Nəşriyyat şöbəsi. Azərbaycan.
E-mail: seferli_1988@bk.ru
https://orcid.org/0000-0002-01104659

**XÜLASƏ**
Molla Murad Xarəzmi (əsl adı Muraddır) XVIII əsrin sonu, XIX əsrin əvvəllərində yaşamış türkmən şairidir. "Molla", "Bəndə", "Xarəzmi" şairin sonradan götürdüyü təxəllüslərdir. M.M.Xarəzminin dörd nüsxədən ibarət "Dilavər və Güləsrar" dastanı sevgi-məhəbbət və qəhrəmanlıq motivləri əsasında yazılmışdır. Dastanda fantastik təsvirlər əks olunmuşdur. Bu tip dastanlar şairin yaşadığı dövr türkmən ədəbiyyatında geniş yayılmışdır. "Dilavər və Güləsrar" mövzu baxımından Şeydainin "Gül və Sənubər", Şahbəndənin "Gül-Bülbül", Maqrubinin "Seyfəlmələk və Mədxalcamal", Yusif Hoca Bakıoğlunun "Ray-Çim" adlı dastanları ilə oxşarlıq təşkil edir. Şair bu dastanında "sevginin azad olması və hər kəsin öz istəyi ilə ailə qurması" fikrini əsas götürmüşdür. İdeal qəhrəman cizgilərini Dilavərin xarakterində əks etdirən yazıçı əsərdə müsbət qəhrəmanlarının hər birini zəkalı və mübariz ruhlu təsvir etmişdir.

**AÇAR SÖZLƏR**
Molla Murad Xarəzmi, "Dilavər və Güləsrar" dastanı, xəyali vasitələr, qəhrəmanlıq səhnələri

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 24.11.2021
qəbul edilib: 29.11.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 4, VOL. 270, 66-73
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.006

A Z E R B A I J A N I  A N D  T U R K M E N  L I T E R A T U R E

# Analysis of Molla Murad Kharazmi and his epos "Dilaver and Gulesrar"

***Aynur Safarli***
Doctoral student of Baku State University, Police Academy of the Ministry of Internal Affairs, Scientific Research and Editorial-Publishing Department. Azerbaijan. E-mail: seferli_1988@bk.ru
https://orcid.org/0000-0002-0110-4659

**ABSTRACT**
Molla Murad Kharazmi is one of the turkmen poets who lived in the late 18th and early 19th centuries. His real name is Murad. The words "Molla", "Banda", "Kharazmi" were later added to the poet's name. Molla Murad Kharazmi's epos "Dilaver and Gulesrar" was written on the basis of love and heroic motives. There are four copies of the saga. The saga contains fantastic images. Such epics were widespread in turkmen literature during the poet's lifetime. In terms of "Dilaver and Gulasrar", Sheydai's "Gul and Sanuber", Shahbenda's "Gul-Bulbul", Magrubi's "Seyfalmelek and Madkhaljamal", Yusif Hodja Bakioglu's "Ray-Chim" epics are close. In this saga, the poet based the idea that "love is free and everyone can get married voluntarily." The writer portrayed the ideal hero with the character of Dilavar. The writer described all his positive heroes as intelligent and combative.

**KEYWORDS**
Molla Murad Kharazmi, “Dilaver and Gulesrar” epos, imaginary means, heroic scenes

**ARTICLE HISTORY**
Received: 24.11.2021
Accepted: 29.11.2021

## Giriş / Introduction

Dastançılıq – xalqın bir neçə əsrlik milli-məişət həyatını gözəllik və əlvanlığı, təzad və ziddiyyətləri ilə özündə əks etdirən qabaqcıl bədii düşüncənin məhsuludur. İnsan həyatı və taleyinin keçməkeşli növrağı ilə bizə tanış olmağa imkan yaradan təhkiyəçilik insanın öz təkamülü ilə bağlı davam edən maraqlı və canlı yaradıcılıq prosesidir. Burada söz sırası sadə, ardıcıl, mənası aydın, konkret, fikrin ifadəsi isə tez anlaşılan olur. Emosional ifadə və deyim tərzləri, pantomim hərəkətlər, himcimlərlə fikrin ifadəsi epik üslub sistemində mövcud deyil, bunlar ifadə olunmuş fikrin psixoloji məqamlarının dürüstləşməsinə və tamamlanmasına xidmət edir. Epik ənənə sadə təhkiyəçilikdən peşəkar ifaçılığa qədər inkişaf yolu keçmiş, milli dastan yaradıcılığı üçün erkən zəmin hazırlamışdır [6, s.64; 2, s.134]. Qədim türk dastanları öz əski tarixinin bir çox önəmli fakt və hadisələrini əks etdirməklə yanaşı, eyni zamanda, epik ənənədə türk düşüncəsinin gözəlliklərini və özünəməxsusluqlarını yaşatmaq baxımından da diqqət cəlb edir [1, s.458-459; 2, s.135].

"Dastan" sözü çoxmənalı söz kimi bacarıq, məharət, hiylə mənalarını verən, həm də qəhrəmanlıq, sevgi macərasını əks etdirən əhvalat deməkdir. Bir istilah kimi bu söz musiqi havası, melodiya və digər mənalarda da istifadə olunur. Bu sözün ikinci dərəcəli mənaları da az deyil ki, bunlar da sabit olmamışdır. Müxtəlif əsərlərdə bu mənaların bəziləri tez-tez və geniş şəkildə işlənmiş, bəziləri isə unudulmuşdur. Lakin belə mənalar nə qədər çox olsa da, dastandan bütün əsrlərdə daha çox ədəbi istilah kimi istifadə edilmiş, indi də edilməkdədir. Geniş mənada bədii əsər mənasını daşıyan bu söz əhvalat, hekayət, macəra, tərifnamə, tərcümeyi-hal, eyni zamanda, rəvayət, hətta xalq romanı, xalq kitabı mənalarını daşımışdır [3, s.57]. "Dastan" eyni zamanda "boy", "qol", "qissə", "nağıl" da adlandırılmış, zaman keçdikcə onun janr xüsusiyyəti başqa ədəbi nümunələrlə müqayisədə araşdırılıb öyrənildikcə, o, spesifik xüsusiyyətlərə malik bədii nümunə kimi xalq ədəbiyyatında elə "dastan" adı ilə sabitləşmişdir. "Həmişə olmuş əhvalat, baş vermiş hadisə, tarixi həqiqət kimi" qəbul edilmişdir [3, s.61].

Məhəbbət dastanlarındakı baş qəhrəman fərddir. Belə ki, o, cəmiyyətdə azad sevgi, xoşbəxt həyat, toxunulmaz insan hüquqları uğrunda mübarizə aparan, onları pozub tapdalayan hökmdarlara, din xadimlərinə, tacir-zadəganlara və sosial üstünlüklərə malik rəqiblərə qarşı dayanan aşiqdir. Məhəbbət dastanlarında ictimai məzmun nə qədər yüksək olsa da, buradakı hadisələr cəmiyyət həyatının ən müxtəlif cəhətlərini nə qədər intəhasızlıqla əks etdirsə də, o, epos düşüncəsi səviyyəsinə

yüksələ bilmir. Ziddiyyət və təzadları əkslikləri qoyulmuş yasaqlıqlar sərhəddində əks etdirməklə kifayətlənir [2, s.137].

Məhəbbət dastanlarında qəhrəmanlığı təcəssüm etdirən epizodlar yetəri qədər olur. Məşuqun sevgisi uğrunda göstərdiyi qəhrəmanlıqların əks olunduğu dastanlardan biri də türkmən ədəbiyyatı nümayəndəsi olan Molla Murad Xarəzminin "Dilavər və Güləsrar" dastanıdır. Dastanı təhlil etməzdən əvvəl müəllif haqqında qısaca məlumat verək.

Həyat və yaradıcılığı haqqında az məlumatlı türkmən şairlərindən olan Molla Murad Xarəzmi XVIII əsrin sonu, XIX əsrin ilk yarısında yaşamışdır. Əsl adı Murad olan şairin adına sonradan "Molla", "Bəndə", "Xarəzmi" adları da əlavə edilmişdir. Təxminən 1782-1788-ci illərdə Xarəzmin Şiraslı obasında doğulan şairin şeirlərinin birində "Əslim Xarəzmli, yerim Şiraslı" misrasına rast gəlirik. İndiki Özbəkistanın Hazarasp mahalına aid bir bölgə olan Şiraslı obasının adına və bu oba ilə bağlı hadisələrə Xivə xanının SSR EA Şərq İnstitutunun Leninqrad bölümündəki arxivdə çox rast gəlinir. Hazarasp və Şiraslı obası həmin illərdə iğdırların əksəriyyət halında yaşadığı bölgə kimi qəbul edilirdi [4, s.130].

Türkmənlərin İğdır boyundan olan şairin atasına Beğenç Tarhan, babasına isə Aman Tarhan deyirmişlər. Ancaq hazırda bu şəxslər haqqında heç bir məlumat mövcud deyil. Xivə mədrəsəsində təhsil alan, dövrünün müdrik insanlarından olan Molla Muradın Xan Məhəmməd və Yaz Məhəmməd adlı iki oğlundan Xan Məhəmmədin Tuvak adlı qızı, Yaz Məhəmmədin isə Gülbay və Səna adlı iki oğlu varmış. Gülbay və Sənanın nəslindən olanlar indiki Daşhovus (Daşoğuz və ya Daşhovuz) və Türkmənbaşı (Krasnovodsk) şəhərində yaşayırlar. Şair məlum olmayan səbəbdən ömrünün sonlarına doğru Manqışlağa köçmüş və orada Özən adlı obada, təxminən 1840-1845-ci illərdə vəfat etmişdir. Hazırda şairin bədii irsindən günümüzə gəlib çatan 30-a yaxın şeiri və iki dastanı ("Dilavər və Güləsrar", "Zöhrə və Tahir") qalmışdır [4, s.130].

V.M.Jirmunskinin yazdığı kimi "epik üslub həyatı dərk etmənin geniş hüdudlarını müəyyənləşdirdi, ağız ədəbiyyatında böyük və ənənəvi hadisə yaratdı" ki, bu da şifahi sözü bədii həqiqətə, həyatın və onun geniş, zəngin mahiyyətini öyrənməyə gətirib çıxardı. Bu isə təhkiyəçiliyin tarixi yüksəlişi və onun nəticəsi olan epos yaradıcılığının meydana çıxması ilə şərtləndi [5, s.213]. Bir çox estetik, mənəvi-əxlaqi, etik və hüquqi dəyərləri özündə birləşdirən epos yaradıcılığı hər bir etnosun mənəvi dəyərləri ilə bağlı olub, onun sivil səviyyəsinin istiqamət və hüdudlarını ifadə edir.

Molla Murad Xarəzminin "Dilavər və Güləsrar" dastanı da bu yaradıcılığın əksi kimi özünü göstərmişdir. Hazırda dastanın dörd nüsxəsi qorunur. Bunlardan üçü Türkmənistan Elmlər Akademiyasının Ədəbiyyat İnstitutunun Əlyazmalar bölümündə 3759, 5487 və 5508 nömrəli qovluqlarda, digəri isə Gürcüstan K.S.Kekelidze adına Əlyazmalar İnstitutunda saxlanılır [4, s.131]. Bu nüsxəni gürcü alimi Georgiy Tseretli 1930-cu illərdə Türkmənistan və Özbəkistanda olarkən naməlum bir şəxsdən satın almışdır. Fantastik təsvirlərin əks olunduğu eşq dastanları şairin yaşadığı dövrdə türkmən ədəbiyyatında geniş yayılmışdır. "Dilavər və Güləsrar" mövzu baxımından Şeydainin "Gül Sənubər", Şahbəndənin "Gül-Bülbül", Maqrubinin "Seyfəlmələk və Mədxalcamal", Yusif Hoca Bakıoğlunun "Ray-Çim" (1252 (1336-1837) adlı dastanlarına yaxındır [4, s.131]. Şeydai və Maqrubinin dastanları XVIII əsrin sonu, XIX əsrin əvvəllərində yazılıb. Bu səbəbdən, Molla Muradın bu dastanlarla tanışlığı mümkün hesab olunur. Bu yazıçılar (Yusif Hoca Bakıoğlu istisna olmaqla) Molla Muradın yaşadığı yerlərə yaxın ərazilərdə yaşayıblar. Şahbəndə Könlürgəncdə, Şeydai isə Manqışlaqda yaşamışdır. Maqrubi də ömrünün sonlarını Manqışlaqda keçirmiş, təxminən 1810-cu illərdə vəfat etmişdir. Beləcə, bu yazıçıların fantastik sevgi dastanı olan "Dilavər və Güləsrar"ın yaranmasına təsiri ola biləcəyi ehtimalı böyükdür.

Müəllif sevdiyi qıza ithaf etdiyi bu dastanda "sevgili" tipini ideal, əlçatmaz (pəri kimi) yaradaraq, ona qovuşmaq üçün qarşılaşdığı çətinlikləri açıq şəkildə təsvir etmək düşüncəsində olmuşdur. Şairin dastanı yazmaqda əsas məqsədi, qarşıya qoyduğu təməl düşüncə – "sevginin azad olması və hər kəsin öz istəyi ilə ailə qurması" fikridir. Ancaq həmin dövrdə bu fikirlər cəmiyyət tərəfindən qəbul olunmadığı üçün güclü əks-təsirlərə məruz qala bilərdi. Bu səbəbdən də, şair fikirlərini dastançılıq ənənələrinə tətbiq edərək, onları düşmən qüvvələrin xüsusiyyətləri arasında göstərmişdir.

Dastanın baş qəhrəmanı Dilavər sevgilisinə qovuşmaq üçün mübarizə aparanda, ona qarşı çıxan öncə ata-anası olur. Şair maneənin valideynlər tərəfindən olduğunu göstərmək və bir növ türkmən ictimai həyatına xas olan xüsusiyyətləri oxuculara çatdırmaqla yanaşı, həm də Dilavərin sevdiyinə qovuşmaqda nə qədər qərarlı olduğunu vurğulamaq istəmişdir.

Bütün fantastik dastanlarda olduğu kimi, burada da Dilavər məqsədi üçün yola çıxanda, şair ona qarşı olan çətinlikləri daha təsirli əks etdirməyə çalışır. Zənni (yəni zənci) və Zaman ölkəsi padşahlarının, cadugərlərin zindanına düşən Dilavərin çətinlikləri zindandan çıxdıqdan sonra da bitmir. Kolan dağında altı ay yolunu azmış şəkildə gəzir. Lakin o, zindana düşənə qədər igidliklə vuruşur. Hətta düşmənləri onu

Rüstəm pəhləvana bənzədirlər. Bərzənnilər onu zindandan çıxaran zaman düşmənlərinə qarşı savaşıb öldürmək, ya da öz yurduna çıxıb getməsi barədə şərt qoyurlar. Hadisənin bu cür gedişi nə "Seyfəlmələk və Mədxalcamal", nə də "Gül və Sənubər" dastanında mövcuddur.

Qəhrəmanlıq səhnələrinə yetərincə yer ayıran şair, sevgi və qəhrəmanlıq motivlərini bir-birilə ustalıqla cilalayaraq, əsərin ideyasını daha da gücləndirmişdir. Əsərdə Dilavəri son dərəcə igid, qorxmaz təsvir edən ədib, onu  qeyri-adi güc sahibi olaraq göstərmək istəməmişdir. O da digər insanlar kimi məğlub olur, aldanır, aciz qalır, amma ən əsası, qarşıya qoyduğu məqsədindən dönmür. Bu isə obraza gerçəklik qazandıraraq, dastanın təsir gücünü artırır. Dilavər igid olmaqla yanaşı, sevgisində mülayimdir. Molla Murad dastanda onun sevgisini "şirindən şirin" sözləri ilə vəsf edir. Oxumuş, tərbiyəli, məlumatlı bir igid kimi yetişmiş Dilavər nəinki sevgilisinə, valideynlərinə, hətta dostları və ətrafına qarşı da mülayimdir.

Yazıçı ideal qəhrəman cizgilərini müəyyən ölçü əsasında Dilavər xarakterinə sığdırmışdır. Bu bütövlüyü sevgi ilə bağlı məsələlərin əks olunmasında, yəni igidlik və sevgi məfhumunu bir-birilə cilalayaraq vermişdir. Yazıçı dastançılıq qəlibindən çıxmadığı üçün Dilavəri bütün xüsusiyyətləri ilə təsvir etməyə nail olmuşdur. Qəhrəmanların qeyri-adi xüsusiyyətlərə malik qızları sevməsi kimi hallar bütün qədim fantastik eşq dastanlarında mövcuddur. "Pəri" motivi istər şifahi, istərsə də yazılı ədəbiyyatda gözəllik rəmzidir. İnsanların pəriləri sevməsi gözəllik qarşısında baş əyməsinə işarədir. Bu motiv əsərə fantastik ruh gətirsə də, sonda sevənlərin arzu və muradları gerçək olur. Yazıçı əsərdə həm də bunu bildirmək istəyib ki, qızlar adi deyilsə, onlara qovuşmaq üçün gedilən yollar da adi olmur. Molla Murad isə Dilavəri sevgilisinə aparan daha fərqli bir yol seçmiş və bunu Güləsrarın obrazında əks etdirmişdir. Müəllif "Güləsrar pəridirsə, sevgilisini gətirməyini də özü həll etsin" düşüncəsini gerçəkləşdirmişdir. Fantastik obrazlar uzun zamanı qısa vaxta döndərir. Güləsrar Dilavəri gətirsin deyə, yaxın rəfiqəsi Gülçöhrəni onun ardınca göndərir. Onun 300 ilə gedilən yolu 40 günə qət etməsi dastanın şərtləri üçün təbii hesab edilir.

Məsələnin maraqlı tərəfi budur ki, bu cür yollar yalnız xəyali insanlarla deyil, real insanlarla da qət oluna bilər. Xəyali vasitələr – sehirli quşlar, sehirli ayaqqabılar, divlərin köməyi ilə igidlər sevdiyi qızlara qovuşa bilərlər. Ancaq Molla Murad qəhrəmanının bu cür vasitələrlə sevdiyi qıza qovuşmasını istəmir. Belə ki, o, Dilavəri bu cür vasitələrlə Güləsrara qovuşdura bilərdi. Görünür, yazıçı adi insanların keçə bilməyəcəyi bu yolları güvəndiyi qəhrəmanının qət edəcəyinə inanır.

Ancaq bu halda "Güləsrarı hərəkətə keçirmək də fantastikaya cəhddir", desək yanılmarıq. Sadəcə bu üsula başqa dastanlarda elə də rast gəlinmir. Dilavərin sevgilisinə qovuşmasından sonrakı həyatı şairi maraqlandırmamışdır. Buna görə də o, dastanda yorulmadan verilən mübarizə nəticəsində hədəfə çatmağın mümkünlüyünü əks etdirmişdir.

Dastanın müəllifi yaratmaq istədiyi müsbət qəhrəmanların hamısını ağıllı və mübariz ruhlu təsvir etmişdir. Gülçöhrə obrazı da bu xüsusiyyətlərə malikdir. Əsər fantastik olsa da, Molla Murad dövrün ictimai həyatında yaşanan hadisələrə laqeyd qalmamışdır. Dilavər Ahen Reba şəhər zindanında həbsdə olarkən, müəllif tərəfindən zindan həyatı elə olduğu kimi də təsvir edilmişdir. Türkmən dastanlarının bir çoxunda zindan həyatı ilə bağlı hadisələr yer alıb. Ancaq Dilavərin düşdüyü zindanın təsviri qədər heç biri inandırıcı olmamışdır. Əsərdə zindanın mühafizəsi, məhkumlara qarşı qeyri-insani davranışlar olduğu kimi təsvir edilmişdir. Dastanın mənzum hissəsinin ədəbi üsluba daha yaxın olmağına baxmayaraq, burada xalq dilinə yaxın ifadə və bənzətmələr çoxluq təşkil edir. Dastanda verilən 80-ə yaxın şeirin hamısı monoloq şəklində, 10-a yaxını isə deyişmə (söyləmə/aytışma) formasında yer almışdır. "Dilavər və Güləsrar" digər dastanlardan bir çox xüsusiyyətlərinə görə fərqlənir. Məsələn, Dilavər yaxın yoldaşlarını itirdikdən sonra yalnız qalır. O, zindanda "Seyfəlmələk və Mədxalcamal"dan fərqli olaraq, düşmənə müqavimət göstərir. Onunla yanaşı Seyfəlmələk və Sənubər də Bərzənnilər ölkəsindən keçir, ancaq Seyfəlmələk yoldaşları Saqit və İsfəndiyarla birlikdə yaxalananda padşaha onu öldürməməsi üçün yalvarırlar:

Yetim eylap saigel məni malına,
Bir şeirim qurbandır sənin yoluna.
Niçin bolup düşdüm munda qoluna,
Öldürip gelmaqıl nahaq qanıma
[4, s.131].

Eyni səhnəni Şeydainin "Gül və Sənubər" dastanında da görürük. Ancaq Dilavər onlar kimi acizliklə yalvarmır, mərdliklə vuruşur. Bu dastanda yolu qət etmək məsələsi də fərqlidir. Belə ki, Şeydainin "Gül və Sənubər" dastanının qəhrəmanı 300 illik, Şahbəndənin "Gül-Bülbül" dastanının qəhrəmanı isə 150 illik yolu sehirli vasitələrlə qət edirlər. Seyfəlmələk və Sənubər sehirli quşun, Bülbül Gülün qardaşı oğlu Səlim ilə (Səlim Gülün qardaşı oğlu olduğu üçün qeyri-adi insandır) divə minərək, "Ray-Çim" dastanının qəhrəmanı isə bu yolu Süleyman peyğəmbərin ona verdiyi sehirli ayaqqabıların köməyi ilə keçir. Ancaq Molla Murad

Dilavəri sevgilisinə aparan başqa yol seçir. Yuxarıda da qeyd etdiyimiz kimi, Güləsrarı hərəkətə gətirir. Şair Dilavəri gətirmək üçün sehirli qüvvələrin köməyindən istifadə etsəydi, o, hər zindana düşəndə onu oradan həmin qüvvələrin köməyi ilə xilas edərdi [4, s.130-133].

**Nəticə / Conclusion**

Yüzillər boyunca türk xalqının həyat tərzini, duyum və düşüncə biçiminin əsas axarını bahadırlıq, cəngavərlik təşkil etdiyindən etnik-mənəvi sistemin güzgüsü olan folklorda, o cümlədən də dastançılıq ənənəsində qəhrəmanlıq motivinin geniş və qabarıq şəkildə yer alması təbii-tarixi zərurətdən irəli gəlmişdir. Qədim türk cəmiyyətində dastan təfəkkürü istisnasız olaraq bahadırlıq düşüncəsinin obrazlaşdırılmasına yönəldiyindən, həmin mərhələyə məxsus epik ənənənin özəyində qəhrəmanlıq motivi və bu motivin ifadəsi olan çeşidli qəhrəmanlıq süjetləri dayanır. Sonrakı tarixi dövrlərdə epik düşüncədə lirik təmayül də müəyyən yer tutmağa başlayır. Bu zaman məhəbbətlə qəhrəmanlıq hüdudlarında dayanan, bir növ hər iki motivin birləşməsini əks etdirən dastanlar meydana çıxır. Epik ənənədə lirik təmayülün güclənməsi sırf məhəbbət motivinə bağlı dastanların meydana gəlməsilə nəticələnir. Beləliklə, araşdırmadan məlum olur ki, məhəbbət dastanları spesifik süjet və kompozisiya tərkibinə malik olan orijinal epik folklor örnəklərdir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Nəbiyev A.M. (2009). Azərbaycan xalq ədəbiyyatı. İki cilddə, I kitab. (Ali məktəb tələbələri üçün dərslik). Bakı, Çıraq nəşriyyatı. 640 s.
2. Səfərli A.M. (2019). Ümumtürk ədəbiyyatında "dastan" anlayışı. Türkiye, "Uluslararası Türk Lehçe Araştırmaları" dergisi. İyun, III c, №1, s.133-139.
3. Təhmasib M.A. (1972). Azərbaycan xalq dastanları (orta əsrlər). Bakı, Elm.
4. Memmetcumayev A. Molla Murat Harezminin Dilaver ve Gülesrar destanı hakkında bazı tespitler. Türkmən türkcəsindən tərcümə edən: Yusuf Akkül. Sayı 6, Yaz 97, s.130-133.
5. Жирмунски В.М. (1974). Тюркский героический епос. Москва, Наука. 725 с.
6. Пропп В.Я. (1958). Русский героический эпос, 2-е издание. Москва, Гос. издательство худож.лит. 603 с.